UOT 633.31/.37;635.65

# ABŞERON ŞƏRAİTİNDƏ SOYA BİTKİSİNİN BUDAQLANMASINA BECƏRMƏ AMİLLƏRİNİN TƏSİRİ

**T.A.NƏSİROVA**
**AKTN Əkinçilik ET İnstitutu**

*Məqalədə 2018-ci ildə Abşeron şəraitində soyanın Amerika mənşəli intensiv tipli Biyson sortunda becərmə amillərinin sortun budaqlanmasına təsirinə dair məlumatlar verilmişdir. Aparılmış tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, soyanın Biyson sortunda aprel ayının 3-cü ongünlüyündə $N_{60}P_{40}$+15 ton peyin variantında hər üç səpin sxemində (60 x 5 sm; 60 x 10 sm; 60 x 15 sm) digər variantlarla müqayisədə bir bitkidə budaqların sayı 3,5-3,9 ədəd çox (6,5-8,3 ədəd) olmuşdur.*

***Açar sözlər:*** *bitki, soya, sort, budaqlanma, amil, gübrə, peyin*

Respublika əhalisinin ərzaq təhlükəsizliyinin təmin olunmasında, heyvandarlıq və quşçuluq təsərrüfatları üçün qüvvəli yem bazasının yaradılmasında soya bitkisi mühüm əhəmiyyət kəsb edir. Dənində zülal çox olduğuna görə paxlalı, yağ çox olduğuna görə isə yağlı bitkilər qrupuna aid edilir. Soya qiymətli texniki, yem və ərzaq bitkisidir. Başqa dənli-paxlalı bitkilərdən fərqli olaraq onun yaşıl kütləsində və dənində olan zülalın miqdarı çox, keyfiyyəti isə yüksək olur. Buna görə də zülal probleminin həllində bu bitkiyə birinci dərəcəli əhəmiyyət verilir.

Soya yağında olan yağ turşularının tərkibi bioloji baxımdan digər bitki yağlarından daha qiymətlidir. Dənli-paxlalı bitkilər içərisində ən yüksək zülallı bitkidir. Yalnız soya dənindən inək südünə yaxın olan süd alınır. Dənin tərkibi qiymətli karbon birləşmələri, vitaminlər, makro və mikro elementlərlə çox zəngindir [1].

Tədqiqatçılar soya bitkisinin məhsuldarlığının bir çox amillərdən-qidalanmanın optimallaşdırılmasından, boy və inkişafın stimullaşdırılmasından və bitkinin xarici mühit amillərinə qarşı davamlılığının artırılmasından asılılığını qeyd etmişlər [2].

Soya bitkisinin qida maddələrinə tələbatı daha yüksəkdir. Aparılmış tədqiqatlar göstərir ki, su və mineral qidalanma rejimi şəraitində soya bitkisinin günəş şüalarını udma qabiliyyəti daha da artır və fotosintez prosesi normal gedir. Nəticədə məhsuldarlıq və məhsulun keyfiyyəti yüksəlir. Soya bitkisindən yüksək yaşıl biokütlə və dən məhsuldarlığı əldə etmək üçün aqrotexniki tədbirlərə və becərmə texnologiyasına düzgün əməl edilməlidir [3, 4].

N.M.Abdullayeva və başqaları Şəki-Zaqatala bölgəsində dəmyə şəraitində soya bitkisinin Biyson sortunda cərgə arası 0,70 m, bitki arası 0,08 m olduqda bir bitkidə budaqların sayının orta hesabla 11 ədəd olduğunu göstərmişlər [5].

S.İ.Hüseynov Abşeronda apardığı tədqiqatlar nəticəsində müəyyən etmişdir ki, gübrəsiz variantda Biyson sortunda bir bitkidə budaqların sayı orta hesabla 19,0 ədəd, $N_{90}P_{60}$ gübrə fonunda isə uyğun olaraq 22,5 ədəd olmuşdur [6].

Soya bitkisinin çoxamilli tarla təcrübələrində yaşıl kütlə və dən üçün becərilməsinin aqrotexniki əsaslarının müəyyən edilməsi, həmçinin bitkilərin məhsuldarlığı və keyfiyyəti ilə sıx əlaqəli olan əlamətlərin aşkar edilərək təsərrüfatlara istifadə üçün tövsiyə edilməsi mühüm əhəmiyyət kəsb edir.

**Material və metodlar.** Qeyd edilənləri nəzərə alaraq Əkinçilik Elmi-Tədqiqat İnstitutunun Abşeron Yardımçı Təcrübə Təsərrüfatında 2018-ci vegetasiya ilində soya bitkisinin ekstensiv tipli Amerika mənşəli Biyson sortundan istifadə etməklə metodikaya uyğun olaraq dən məhsulu almaq üçün üç amilli (səpin müddətləri, bitki sıxlığı, qidalanma şəraiti) tarla təcrübəsi qoyulmuşdur.

**1-ci amil: Səpin müddətləri**

1. Aprelin 2-ci ongünlüyündə səpin
2. Aprelin 3-cü ongünlüyündə səpin
3. Mayın 1-ci ongünlüyündə səpin

**2-ci amil: Bitki sıxığı**

1. 60 x 5 sm sxemində səpin (hektarda bitki sayı 333 min)
2. 60 x 10 sm sxemində səpin (hektarda bitki sayı 167 min)
3. 60 x 15 sm sxemində səpin (hektarda bitki sayı 111 min)

**3-cü amil: Qidalanma şəraiti**

1. Gübrəsiz
2. $N_{60}P_{40}$+15 ton peyin
3. $N_{90}P_{60}K_{40}$

Tarla təcrübləri 3 təkrarda hər ləkin sahəsi 48 $m^2$ olmaqla B.A.Dospexov motodu ilə aparılmışdır [7].

Budaqların sayı tam yetişmə fazasında 25 bitki üzərində aparılaraq əldə edilən nəticələr təhlil edilmişdir (cədvəl).

**Tədqiqatın nəticələri və müzakirəsi**. Səpin müddətinin, əkin sxeminin və qidalanma şəraitinin soya bitkisinin budaqlanmasına təsiri öyrənilmişdir. Apardığımız təcrübələr göstərir ki, səpin müddəti, əkin sxemi və üzvi və mineral gübrələr bir bitkidə budaqların sayına əhəmiyyətli dərəcədə təsir göstərmişdir (cədvəl). Tədqiqatlar zamanı müəyyən edilmişdir ki, aprel ayının 2-ci ongünlüyündə səpin aparıldıqda nəzarət (gübrəsiz) variantında bitki sıxlığından asılı oalarq bir bitkidə budaqların sayı 2,3-4,4 ədəd, $N_{60}P_{40}$+15 ton peyin variantında müvafiq olaraq 5,0-6,2 ədəd, $N_{90}P_{60}K_{40}$ variantında müvafiq olaraq 4,7-5,8 ədəd olmuşdur.

Aprel ayının 3-cü ongünlüyündə səpin aparıldıqda nəzarət (gübrəsiz) variantında bitki sıxlığından asılı oalarq bir bitkidə budaqların sayı 2,6-4,8 ədəd, $N_{60}P_{40}$+15 ton peyin variantında müvafiq olaraq 6,5-8,3 ədəd, $N_{90}P_{60}K_{40}$ variantında müvafiq olaraq 6,3-7,6 ədəd təşkil etmişdir.

May ayının 1-ci ongünlüyündə səpin aparıldıqda nəzarət (gübrəsiz) variantında bitki sıxlığından asılı oalarq bir bitkidə budaqların sayı 2,4-4,6 ədəd, $N_{60}P_{40}$+15 ton peyin variantında müvafiq olaraq 6,2-8,1 ədəd, $N_{90}P_{60}K_{40}$ variantında müvafiq olaraq 5,8-7,5 ədəd olmuşdur.

**Cədvəl.** Səpin müddətinin, əkin sıxlığının və gübrə normalarının soya bitkisinin budaqlanmasına təsiri, ədəd

| Səpin müddəti | Gübrə normaları | Dən üçün tam yetişmə fazasında | | |
|---|---|---|---|---|
| | | Bitki sıxlığı | | |
| | | 60 x 5 sm | 60 x 10 sm | 60 x 15 sm |
| Aprel ayının 2-ci ongünlüyü | Nəzarət (gübrəsiz) | 2,3 ± 0,17 | 3,8 ± 0,07 | 4,4 ± 0,03 |
| | $N_{60}P_{40}$+15 ton peyin | 5,0 ± 0 13 | 5,6 ± 0,30 | 6,2 ± 0,37 |
| | $N_{90}P_{60}K_{40}$ | 4,7 ± 0,43 | 5,2 ± 0,07 | 5,8 ± 0,43 |
| Aprel ayının 3-cü ongünlüyü | Nəzarət (gübrəsiz) | 2,6 ± 0,20 | 4,0 ±0,07 | 4,8 ± 0,06 |
| | $N_{60}P_{40}$+15 ton peyin | 6,5 ± 0,13 | 7,6 ± 0,20 | 8,3 ± 0,27 |
| | $N_{90}P_{60}K_{40}$ | 6,3 ± 0,33 | 7,2 ± 0,37 | 7,6 ± 0,20 |
| May ayının 1-ci ongünlüyü | Nəzarət (gübrəsiz) | 2,4 ± 0,03 | 3,9 ± 0,50 | 4,6 ± 0,07 |
| | $N_{60}P_{40}$+15 ton peyin | 6,2 ± 0,10 | 7,5 ± 0,43 | 8,1 ± 0,40 |
| | $N_{90}P_{60}K_{40}$ | 5,8 ± 0,07 | 7,0 ± 0,47 | 7,5 ± 0,17 |

Aparılmış tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, soyanın Biyson sortunda aprel ayının 3-cü ongünlüyündə $N_{60}P_{40}$+15 ton peyin variantında hər üç səpin sxemində (60 x 5 sm; 60 x 10 sm; 60 x 15 sm) digər variantlarla müqayisədə bir bitkidə budaqların sayı 3,5-3,9 ədəd çox (6,5-8,3 ədəd) olmuşdur.

**ƏDƏBİYYAT**

1.Hartwing E.E. Breeding of soybean for high seed yield and seed protein // Soy bean feeds the world. Bangkok-Thailand, 1997, p. 40-43. 2.Ран О.П., Селихова О.А., Тихонгук П.В. Применение биологических препаратов в посевах сои // М.: Достижения науки и техники АПК. 2009, №08, с. 26-27. 3.Əliyev C.Ə., Əkpərov Z.İ., Nəbiyev M.H. Azərbaycan SSP-nin suvarma şəraitində soyanın yetişdirilməsi, Bakı-1982, s. 14. 4.Cafer Mart, Batuhan Akgöl, A-dan Z-yə soya tarımı, seed ProGen, 2015, s. 24-28. 5.N.M.Abdullayeva, C.M.Təlai, M.Ş.Yusubov Şəki-Zaqatala bölgəsində dəmyə şəraitində soyanın Biyson sortunun becərilməsi // Əkinçilik ETİ-nin Elmi əsərləri məcmuəsi, XXIX cild, "Müəllim nəşriyyatı" Bakı-2018, s. 368-372. 6.Гусейнов С.И. Биохимическая характеристика зерна сои и связи с сортовыми особенностями и условиями возделывания // дис. на кан. биол. наук, Баку-1989, 182 с. 7.Доспехов, Б.А. Методика полевого опыта // М.: Агропромиздат, 1985, 342 с.

**Влияние условий выращивания на ветвление сои в условиях Абшеронского региона**

**Т.А.Насирова**

В статье представлена информация о влиянии условий выращивания сортов сои в интенсивном типе американского происхождения сои «Bison» о ветвлении в регионе Абшерон 2018 года. В результате исследования было установлено, что в типе соков «Bison» в третьей декаде апреля $N_{60}P_{40}$+15 тонн моли были сопоставлены с другими разновидностями трех посевных плоскостей (60 х 5 см, 60 х 10 см, 60 х 15 см) , 5-3,9 единиц больше (6,5-8,3 единицы).

***Ключевые слова:*** *растения, соя, сорт, ветвление, фактор, удобрения, навоз*

**The effect of cultıvatıon factors on branchıng of soybean varıetıes ın Absheron regıon**

**T.A.Nasirova**

*The article provides information about the effect of cultivation factors on branching of variety at the intensive Biyson type of American origin of soybean varieties, in the Absheron region in 2018.*

*As a result of the study, in the third decade of April, it was determined that in the Bison type of soybeans, in every three planting schemes (60 x 5 cm; 60 x 10 cm; 60 x 15 cm), at* $N_{60}P_{40}$+15 *tons of manure, the number of branches on a plant was 3,5-3,9 units more (6,5-8,3 units) than the ones on the other versions.*

***Key words:*** *plant, soybean, variety, branching, factor, fertilizer, manure*

*E- mail: t_nasirova@mail.ru*